# SALEH MƏHƏRRƏMOV - 50



Saleh Heydər oğlu Məhərrəmov 25 sentyabr 1965-ci ildə Şərur rayonunun Alışar kəndində anadan olmuşdur. 1987-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu (indiki Azərbaycan Dövlət Aqrar Universiteti) fərqlənmə diplomu ilə bitirmişdir.

S.H.Məhərrəmov 1991-ci ildə Moskva şəhərində Ümumittifaq Helmintologiya İnstitutunda namizədlik, 2011-ci ildə AMEA Zoologiya İnstitutunda «Naxçıvan Muxtar Respublikasında qoyunların kompleks helmintofaunasının formalaşma xüsusiyyətləri, mədə-bağırsaq nematodlarına qarşı antihelmint bitkilərin tətbiqi və onların toksikoloji qiymətləndirilməsi» mövzusunda doktorluq dissertasiyasını müdafiə etmişdir..

1999-cu ildə Naxçıvan Dövlət Universitetinin Zoologiya kafedrasının müdiri vəzifəsinə seçilmiş, 2000-2013-cü illərdə həmin universitetin «Təməl tibb fənləri» kafedrasının müdiri vəzifəsində çalışmışdır.

S.H.Məhərrəmov 17 may 2013-cü ildə Naxçıvan Dövlət Universitetinin rektoru vəzifəsinə təyin olunmuşdur. 2014-cü ildə AMEA-nın müxbir üzvü seçilmişdir.

S.H.Məhərrəmovun tədqiqatlarının əsasını antihelmint təsirə malik bitkilərin müəyyən edilməsi, onların səmərəli formalarının işlənilib hazırlanması və toksiki xüsusiyyətlərinin araşdırılması təşkil edir. Bununla yanaşı, yovşan-üzərlik, qalxanəkdirçək və çaşır-aclıq qarışıqlarının laboratoriya heyvanları üzərində kəskin toksiki parametrləri, kumulyativ xassələri, sinir sisteminə, mərkəzi sinir sisteminin koordinasiyanı nizamlamaq, həmçinin oyadıcı və ləngidici funksiyalarına, heyvanların poza və davranışlarına, sidik ifrazına, göz bəbəyinin mənfəzinə, qan dövranına yerli və embriogen təsiri öyrənilmişdir. Qoyun orqanizminin ümumi kliniki vəziyyətlərinə, qanın, sidiyin fiziki-kimyəvi xassələrinə, daxili orqanlara histoloji təsir, gövşəmə aktına, mədə-bağırsaq traktına, funksional yüklənmiş heyvan orqanizminə, nəsilvermə funksiyasına təsiri müəyyənləşdirilmişdir. Antihelmint təsirə malik bitkilərin yayıldığı otlaq sahələrinin helmintosid dərəcəsinə əsasən iqtisadi səmərəlilikləri hesablanmışdır. Tədqiqatçı, eyni zamanda Naxçıvan Muxtar Respublikasının kompleks helmintofaunasını işləmiş, helmintlərin ekoloji amillərdən asılı olaraq müxtəlif zonalarda və gövşəyən heyvanlarda yayılmasını öyrənmişdir. Tədqiqatların nəticələri Rusiya, Ukrayna, Türkiyə və İranda keçirilən beynəlxalq konfranslarda məruzə kimi təqdim edilmişdir.

S.H.Məhərrəmov dövlətin böyük diqqət və qayğısı sayəsində universitetin maddi-texniki bazasını zənginləşdirməyə, yeni tədris korpuslarının tikilməsinə xüsusi diqqət yetirmışdır. Cənubi Koreyanın KOİCA şirkəti ilə «Elektron Universitet» layihəsi uğurla başa çatmış, universitetdə bütün işlərin onlayn həyata keçirilməsinə nail olunmuş, şöbələr, fakültə və kafedralar yeni, müasir kompüterlərlə təmin edilmiş, yeni elektron lövhələr quraşdırılmış, akademik idarəetmə və tədris prosesinin keyfiyyəti daha da yüksəlmişdir. S.H.Məhərrəmov Naxçıvan Dövlət Universiteti ilə xarici ölkə universitetləri arasında əlaqə yaradılmasına xüsusi səy göstərmiş, Rusiya, Fransa, Polşa, Türkiyə, Koreya və başqa ölkələrin aparıcı universitetləri ilə ikitərəfli əlaqələrin formalaşmasını reallaşdırmışdır.

Saleh Məhərrəmov 101 elmi məqalənin, 3 monoqrafiyanın, 2 dərs vəsaitinin, 2 proqram, 2 təklif və 1 metodik vəsaitin müəllifidi. Onun rəhbərliyi altında 1 elmlər doktoru, 9 fəlsəfə doktoru dissertasiya işi yerinə yetirilir.

2007-ci ildə "Qabaqcıl təhsil işçisi" döş nişanı ilə təltif olunmuş, 2014-cü ildə "Əməkdar elm xadimi" fəxri adına layiq görülmüşdür.